surəsinin 200-cü ayəsində deyilir: “Ey iman gətirənlər! (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) səbr edin, (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə ) dözün, (sərhəd boyu növbədə durub cihada) hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!” (Qurani- Kərim, 1992: 75).

Müqəddəs ayədə mötərizədə verilmiş “Sərhəd boyu növbədə durub cihada” hazır olmaq ibarəsi isə kontent analiz baxımından şəhidlik zirvəsinin bilavasitə mücəssəməsi olub ən böyük fəxarət və qürur anlamını formalaşdırır. Həmin surənin 169-cu ayəsində isə deyilir: “Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə! Xeyr, onlar öz Rəbbinin yanında diri olub ruzi (cənnət ruzisi) yeyirlər” (Qurani- Kərim, 1992, 71). İslam dininin qurucusu olan Məhəmməd Peyğəmbərin (ə) hədislərində sərhədin “müqəddəslik” formatı daha da konkretləşmişdir: “Ölümdən sonra hər bir əməl öz sahibini tərk edər, yalnız Allah yolunda sərhədi qoruyan kimsənin əməlindən başqa. Onun əməli böyüyər və Qiyamət gününədək ruzisi verilər” (Reyşəri, 2009: 181).

## Nəticə

Nəhayətdə sərhədşünaslıq fonunda apardığımız kiçicik elmi-fəlsəfi və teoloji yanaşma prinsiplərini aşağıdakı qaydada ümumiləşdirmək mümkündür:

– Çağdaş dövlətçilik konyukturasında ordu metamodeli birmənalı şəkildə suverenlik və ərazi bütövlüyünün qarantıdır. Onun təkmilləşməsi, modern inkişaf strategiyaları üzərində qurulması və digər nəsnələri dövlət və vətəndaş cəmiyyətinin başlıca vəzifəsi olmalıdır. Belə ki, hərb tarixinin kanonik əsərlərindən biri sayılan qədim Çinin “Hərb sənəti”ndə deyilir: “Ordudakı forma suya bənzəyir: Suda olan forma-yüksəklikdən qaçmaq və alçaqlığa can atmaqdır; orduda olan forma dolu ilə üz-üzə gəlməkdən qaçmaq və boşluğa zərbə endirməkdir. Su ərazidən asılı olaraq öz axarını müəyyən edir; ordu düşməndən asılı olaraq qələbəsini müəyyən edir. Ona görə ordudakı qüdrət dəyişəndir, suda dəyişməz forma yoxdur. Kim ki, dəyişikliklərə və çevrilmələrə malik olur, o qələbə qazanır və bu da ilahilik adlanır” (Tszin, 2009: 159).

– Dövlət və vətəndaş cəmiyyətinin uğurlu inteqrasiya mexanizmlərindən biri onun bilavasitə həmin xalqın tarixi arxetipləri, milli xarakter sütunları üzərində qurulmasıdır. Arxetip və milli xarakter cəmiyyətin mənəvi, əxlaqi, tarixi kulturoloji, psixoloji, dini və digər nəsnələrin toplusudur. Şübhəsiz, söhbət neqativ anlamlardan deyil, səbatlı xüsusiyyətlərə malik proqressiv ideyalardan gedir. Bu yönümdən məşhur fransız filosofu Russo söyləmişdir: “Bir dəfə adətlər yetişib kök atdımı, artıq onları düzəltməyə çalışmaq həm təhlükəli, həm də əbəsdir. Xalq, aradan qaldırmaq üçün belə olsa, dərdlərinə kimsənin toxunmasını istəməz, eynilə həkimi görüncə titrəməyə çalışan ağılsız və qorxaq xəstələr kimi” (Russo, 2022, 64).

Texnoloji-informasiya sferasında tərəqqinin geniş vüsət aldığı bir dövrdə cəmiyyətin sağlam inanclarını, dəyərlərini qorumaq kifayət qədər çətin bir prosesdir. Xüsusilə “nihilizm və liberal həyat tərzi” fonunda müxtəlif sosial şəbəkə seqmentləri, kütləvi informasiya vasitələrinin təbliğat manipulyasiyası qlobal bir əndazəyə çevrilmişdir. Neofreydizm fəlsəfi-psixoloji cərəyanın yaradıcılarından biri olan sosial psixoloq və filosof Erix Frommun dediyi kimi: “Radio, televiziya, kino və gündəlik qəzetlərdən hamı azad istifadə edə bilər. Amma kütləvi informasiya vasitələri bizi keçmişin və müasir dövrün ən yaxşı ədəbi və musiqi əsərləri ilə tanış etmək əvəzinə, adamların beynini bir az mədəni səviyyəsi olanların öz asudə vaxtının hətta ən cüzi bir hissəsini də sərf etməyəcəyi, reklam əlavəsinə bənzəyən, ən aşağı səviyyəli, gerçəklikdən uzaq və sadist təxəyyüllə dolu olan cəfəngiyyatla doldurur” (Fromm, 2019: 7).

Dünya şöhrətli elmi-siyasi xadim, sovetlər dönəmində “təhlükəli ideoloq” ləqəbi ilə tanınan Zbiqnev Bjezinski isə mövcud məsələyə dövlətçilik prizması baxımından daha sərt mövqe sərgiləmişdir: “Müasir rabitə sistemləri bu insanlar və ənənəvi hakimiyyət arasındakı məsafəni artırır və onların şüurunda ədalətsizliyin hökm sürdüyü hissini get-gedə daha geniş şəkildə formalaşdırır ki, bu da etiraz doğurur və buna görə də onlar ekstremist ideyalara münasibətdə daha həssasdırlar və ekstremistlərin cərgələrini asanlıqla artırırlar” (Bjezinski, 2020: 296).

Məhz bu yönümdən stabil dövlət və vətəndaş cəmiyyətin etnopsixoloji dəyərlərini müxtəlif məzmunlu aşınmalardan qorumaq üçün kompleks struktur tədbirlər hazırlanmalı, ehtiyac olduğu

təqdirdə sərt senzura xarakterli addımlar atılmalıdır. Unutmayaq ki, vahid Azərbaycan xalqı olaraq müstəqillik, xüsusilə ərazi bütövlüyümüzün, sərhədlərimizin bərpası məhz milli xarakter, o cümlədən qədim tarixə sahib etnopsixoloji dəyərlərimizə olan sadiqlik fonunda həyata keçirilmişdir.

– Sərhədşünaslıq elminə olan teoloji yanaşma kifayət qədər kompetent dəyərlərə malikdir. Çünki islam dininin sakral dəyərləri xalqımızın tarixi kulturoloji dəyərlərinin ayrılmaz tərkib hissəsidir. Müqəddəs sərhədlərimizin bütövlüyü uğrunda aparılan döyüşlərdə hamımız bu dəyərləri aşkar cizgilərlə müşahidə etdik. Məhəmməd Peyğəmbərin (ə) hədislərində də həmin ornamentlər daha aydın seçilir: "Bir gün və bir gecə sərhəddə keşik çəkmək, gündüzü orucla gecəsi ibadətlə keçirilən bir aydan daha xeyirlidir. Əgər şəxs bu növbə əsnasında ölərsə, gördüyü işin əcri və savabı qiyamətə qədər davam edər, şəhid olaraq ruzisi də davam edər (cənnətdə ruzi ilə təmin olunar) və qəbirdəki sual mələklərindən qorunar (hesabın sıxıntısını çəkməz)" (Murad, 2010: 578).

Başqa bir hədisdə isə sərhədşünaslıq elminə yönəlik təbəddülatlar daha da konkretləşmişdir: "İki göz cəhənnəm odu görməyəcək: Allah xofundan ağlayan göz və Allah yolunda gecə vaxtı keşik çəkən göz" (Reyşəri, 2009: 181).

– "Sərhədşünaslıq elmi" kateqoriyasında apardığımız təhlillərin yekun qənaəti olaraq onu deyə bilərik sərhədin qorunması və ya təhlükəsizliyinin təmini təkcə silahı "Qayışa" və ya "Kürəyə" vəziyyətində saxlamaqla bilavasitə sərhəd xidmətinin təşkilindən ibarət deyil. Milli xarakter, tarixi etnopsixoloji və digər arxetipik dəyərlər fonunda istənilən demokratik vətəndaş cəmiyyəti praqmatik, o cümlədən abstrakt məfhum olaraq məhz bu zərurətə əbədi olaraq riayət etməlidir: Hamımız sərhədçi olmalıyıq!

## Ədəbiyyat

1. Makiavelli, N. (2008). *Hökmdar*. Qızıl Şərq.
2. Nəzəroğlu, C. (2022). *Danışığınla həyatı qazan*. Qanun.
3. Hərbi bilik. (2007). *Hərbi nəşriyyat*.
4. Cəmşidov, Ş. (1999). *Kitabi- Dədəm Qorqud*. Elm.
5. Kissincer, H. (2019). *Dünya nizamı*. Qanun.
6. Şirəliyev, H., Əhmədov, Ə. (2021). Politologiya. Gənclik.
7. Bünyadov, Z., Məmmədəliyev, V. (1992). *Qurani-Kərim*. Olimp.
8. Reyşəri, M. (2009). Mizanul-hikmət. Nurlar.
9. Tszin, U. (2009). *Hərb sənəti*. Zəkioğlu.
10. Russo, J. (2022). *İctimai müqavilə*. Qanun.
11. Fromm, E. (2019). *Sağlam cəmiyyət*. Qanun.
12. Bjezinski, Z. (2019). *Böyük şahmat taxtası*. Qanun.
13. Murad, K. (2010). *Peyğəmbərimizdən həyat ölçüləri - 250 hədis tərcüməsi və şərhi*. İpəkoğlu.

Daxil oldu: 26.08.2024
Baxışa göndərildi: 07.09.2024
Təsdiq edildi: 07.10.2024
Çap olundu: 30.10.2024

**TƏBİƏT ELMLƏRİ**

**NATURAL SCIENCES**

https://doi.org/10.36719/2789-6919/38/65-70

**Əli Zalov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
kimya üzrə elmlər doktoru, professor
zalov1966@mail.ru
**Sürəyya İsayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
riyaziyyat üzrə fəlsəfə doktoru
surayye.necefova@gmail.com

# İnteqralın kimyaya tətbiqi

*O, elmin ki, riyaziyyatla əlaqəsi yoxdur və oraya riyazi elmlərdən birirsi tətbiq oluna bilməz, onda o elmdə heç bir dəyişiklik edilə bilməz.*

**Xülasə**

Məqalədə riyazi analizin əsas bölmələrindən olan inteqral anlayışının kimya elminin müxtəlif sahələrində tətbiqi ilə əlaqədar bəzi məsələlərə baxılır. Məlumdur ki, bir çox riyazi kəşflər təbiət hadisələrinin müşahidəsi nəticəsində edilmiş və riyazi anlayışlar, teoremlər real həyatla sıx əlaqəlidir. Maddələrin xassələrini və onların çevirmələrini, bu çevrilmələr zamanı baş verən hadisələri öyrənən kimya elmi də eksperimental elmdir. Maddələrin bir çox xassələri ədədlərin köməyi ilə ifadə olunur. Kimyəvi reaksiyaların mexanizminin öyrənilməsi, maddələrin quruluşunun tədqiqi müasir fiziki nəzəriyyə və metodlardan istifadəyə əsaslanır. Bir çox kimyəvi proseslər istilik effekti ilə müşayət edilir. Kimyəvi reaksiyanın istilik effektinin temperaturdan asılılığı Kirxqoff tənliyi ilə ifadə olunur. Praktik hesablamalarda Kirxqoff tənliyini inteqrallamaq daha əlverişlidir. Termodinamikanın II qanununun riyazi ifadəsi olan Klauzius tənliyini diferensial və inteqral formada yazmaq olar. Termodinamika müxtəlif proseslərdə enerji keçidlərini və maddələrin enerji dəyişiklərini öyrənir. İnteqral termodinamikanın əsas tənliklərinin həllində əhəmiyyətlidir. Maddələrin spektrlərinin öyrənilməsi sahəsində inteqral molekulların enerji səviyyələrinin analizi üçün istifadə olunur. Maddələrin tərkibində atomlar arasında kimyəvi rabitənin öyrənilməsində əhəmiyyət kəsb edən infraqırmızı spektroskopiyada zaman aralığında olan spektral məlumatları tezlik aralığına çevirmək üçün inteqralın tətbiqi vacibdir. Müxtəlif tərtibli reaksiya üçün inteqralların necə tətbiq olunması məqalədə şərh edilmişdir.

***Açar sözlər:*** *istilik tutumu, inteqral, Krixqoff tənliyi, termodinamika, kimyəvi reaksiyalar, spektroskopiya, izotermal proses*

**Ali Zalov**
Azerbaijan State Pedagogical University
Doctor of Science in Shemistry, Professor
zalov1966@mail.ru
**Suraya Isayeva**
Azerbaijan State Pedagogical University
Doctor of Philosophy in Mathematics
surayye.necefova@gmail.com

# Application of the Integral to Chemistry

## Abstract

The paper considers some problems related to the application of the concept of integral, which is one of the main sections of mathematical analysis, in various fields of chemistry. It is known that many mathematical discoveries were made as a result of observing natural phenomena, and mathematical concepts and theorems are closely related to real life. Chemistry, which studies the properties of substances and their transformations, and the events that occur during these transformations, is also an experimental science. Many properties of substances are expressed with the help of numbers. The study of the mechanism of chemical reactions, the study of the structure of substances is based on the use of modern physical theories and methods. Many chemical processes are accompanied by a heat effect. The temperature dependence of the thermal effect of a chemical reaction is expressed by the Kirchhoff equation. In practical calculations, it is more convenient to integrate the Kirchhoff equation. The Clausius equation, which is a mathematical expression of the second law of thermodynamics, can be written in differential and integral form. Thermodynamics studies energy transitions and energy changes of substances in various processes. The integral is important in solving the basic equations of thermodynamics. The field of studying the spectra of substances is also used for the analysis of the energy levels of integral molecules. It is important to use the integral to convert the spectral data in the time interval to the frequency interval in infrared spectroscopy, which is important in the formation of chemical bonds between atoms in the substances. How to apply integrals for reactions of different designs is described in the paper.

***Keywords:*** *integral, heat capacity, Kirchoff's equation, thermodynamics, chemical reaction, spectroscopy, isotermal process*

## Giriş

Riyaziyyatın təbiət elmlərinin inkişafında rolu danılmazdır. İngilis fiziki və riyaziyyatçısı Rodjer Penrouz hesab edir ki, riyazi qanunlar insan təfəkkürünün təzahürü deyil, təbiətin ayrılmaz hissəsidir. Eksperimental elm olan bir çox riyazi kəşflər təbiət hadisələrinin müşahidəsi yolu ilə edilmişdir və riyazi anlayışlar, o cümlədən teoremlər real həyatla əlaqəlidir. Maddələrin xassələrini və onların çevirmələrini öyrənən kimya təcrübəyə əsaslanan elmdir. Maddələrin bəzi xassələri ədədlərin köməyi ilə ifadə olunur. Kimyəvi reaksiyaları, maddələrin quruluşunu, tərifini vermək üçün fiziki nəzəriyyə və metodlardan istifadə edilir. Bu mənada kimya elmini riyaziyyatsız təsəvvür etmək mümkün deyil. Kimya elminin böyük kəşfləri həndəsənin, cəbrin, riyazi analizin bəzi bölmələrinə əsaslanmışdır (Cəbrayılov, Əliyev, 2016: 71).

## Tədqiqat

Bu məqalədə riyazi analizin əsas bölmələrindən olan inteqral anlayışının kimya elminin ayrı-ayrı sahələrində tətbiqi ilə əlaqədar bəzi məsələlərə baxılır. Kimyada daha çox istifadə olunan inteqral düsturları (Davidov, Korovkin, Nikolski, 1973: 56 ):

$$\int_{-\infty}^{\infty} e^{-ax^2}dx=\sqrt{\frac{\pi}{a}},\quad \int_0^{\infty} e^{-ax}dx=\frac{1}{a}\ ,\quad \int_0^{\infty} x^n e^{-ax}dx=\frac{n!}{a^{n+1}}\quad (n\geq 0\ )$$

Kimyəvi reaksiyanın istilik effektinin temperaturdan asılılığı Kirxqoff tənliyi ilə ifadə edilir (Demidoiç, 2003: 152).

Kimyəvi reaksiyanın istilik effektinin temperaturundan asılılığı $p=const$ olduqda Kirxqoff tənliyi ilə ifadə olunur.

$$\left(\frac{\partial_{\Delta} H}{\partial T}\right)_p=\Delta C_p \qquad (1)$$

$\Delta C_p$ -kimyəvi reaksiyanın bir gedişi nəticəsində izobar istilik tutumunun dəyişməsidir.

$$\Delta C_p = \sum_{j=1}^{m} \partial_j C_{p,j} - \sum_{i=1}^{n} \partial_i C_{p,i} \quad (2)$$

Əgər reaksiya standart (sabit) şəraitdə baş verərsə, onda (1) Kirxqoff tənliyi aşağıdakı şəklə düşər.

$$\frac{d\Delta H^0}{dT} \Delta C_0^p \quad (3)$$

(1) və (3) ifadələri Kirxqoff tənliyinin diferensial forması adlanır: $\frac{d\Delta H^0}{dT}\left(\frac{\partial \Delta H}{dT}\right)_p$ -kimyəvi reaksiyanın istilik effektinin temperatur əmsallarıdır.

Praktik hesablamalarda Kirxqoff tənliyini inteqrallamaq lazımdır. Bunun üçün əvvəlcə dəyişənləri ayıraq (Eremin, 2019, s.234).

$$\int_{\Delta H^0_{T_1}}^{\Delta H^0_{T_2}} d\Delta H^0 = \int_{T_1}^{T_2} \Delta C_p^0 dT$$

Beləliklə, Kirxqoff tənliyinin inteqral forması aşağıdakı kimi olur.

$$H^0_{T_2} = H^0_{T_1} + \int_{T_1}^{T_2} \Delta C_p^0 dT \quad (4)$$

Əgər $T_1 = 298k$ və $T_2 = T$ olarsa, onda (4) aşağıdakı şəklə düşər:

$$\Delta H^0_T = H^0_{298} + \int_{298}^{T} \Delta C_p^0 dT \quad (5)$$

$\Delta H^0_T - T$ temperaturda kimyəvi reaksiyanın istilik effekti $H^0_{298} - 298k$ kimyəvi reaksiyanın istilik effektidir.

Termodinamikanın II qanunu Klauzius bərabərsizliyini riyazi dildə diferensial və inteqral formada yazmaq olar (Fixtgenqols, 1968, s.284).

$$ds \geq \frac{\delta Q}{T} \quad (6)$$

$$\Delta S \geq \int_1^2 \frac{\delta Q}{T} \quad (7)$$

Burada $S$ -entropiya adlanır, $coulk^{-1}$ $\frac{\delta\theta}{T}$-prosesin istiliyidir.

***Termodinamika*** – enerjinin müxtəlif formaları arasında keçidləri və maddələrin enerji dəyişikliklərini öyrənir. İnteqral termodinamikanın əsas tənliklərinin həllində əhəmiyyətlidir. Məsələn, izotermal proseslər üçün işi hesablamaq inteqralın tətbiqi ilə həyata keçirilir (Kalındyuk, Petrov, Çijova, 2023: 210).

$$W = 1 - \int_{v_1}^{v_2} pdv \quad \text{və ya} \quad W = nRT - \int_{v_1}^{v_2} pdv$$

**Məsələ 1**. Başlanğıc həcmi $V_1 = 10\ell$ olan $n = 2mol,$ olan ideal qazın $T = 300K$ temperaturunda son həcmi $V_2 = 20\ell$ olur. Bu qazın gördüyü işi hesablayaq.

**Həlli:** Qaz sabiti: $R = 8{,}314 J(mol \backslash K)$

$n = 2mol; \quad T = 300K$

$V_1 = 10\ell = 0{,}01m^3; \; V_2 = 20\ell = 0{,}02m^3$

$P = \frac{nRT}{V}$ - 1 düstur üçün

$$P = \frac{2 \cdot 300 \cdot 8{,}314}{0{,}01} = 499884Pa \approx 500kPa$$

$$W = 500 \cdot \ln v \Big|_{10}^{20} = 500 \cdot \ln\left(\frac{1}{2}\right) \approx 500 \cdot 0{,}693 \approx 3469{,}5J$$

II düstura tətbiq

$$W = 2 \cdot 8{,}314 \cdot 300 \cdot \ln\left(\frac{20}{10}\right) \approx 2 \cdot 8{,}314 \cdot 300 \cdot 0{,}693 \approx 3469{,}5J$$

***Spektroskopiya*** - kimyəvi maddələrin spektrlərinin öyrənilməsi ilə məşğuldur. Bu sahədə inteqrallar molekulların enerji səviyyələrinin analizi üçün istifadə olunur. Fourier transfor infraqırmızı (FTİR) spektroskopiyada spektral məlumatın Fourier çevrilişini hesablamaq üçün inteqralın tətbiqi vacibdir.

$$F(v) = \int_{-\infty}^{\infty} f(t) e^{-2\pi i v t} dt$$

Bu inteqral tənlik, zaman aralığında olan məlumatları tezlik aralığına çevirmək üçün istifadə edilir və bu da molekulyar strukturların və dinamikaların daha dəqiq öyrənilməsinə imkan verir (Zalov, Abdullayeva, 2023: 97-103).

**Məsələ 2.**Maddənin absorbsiya spektrində absorbsiya intensivliyi $J(\lambda)$ funksiyası aşağıdakı kimi verilir:

$$J(\lambda) = Ae^{-k\lambda}$$

$A$ və $k$ -sabitlərdir. Bu spektrin altında qalan sahəni tapaq.

**Həlli:** Spektrin altında qalan sahə $S$ aşağıdakı inteqral ilə verilir:

$$S = \int_{\lambda_1}^{\lambda_2} J(x) d\lambda$$

Verilən funksiyanı yerinə qoyaq.

$$S = \int_{\lambda_1}^{\lambda_2} Ae^{-k\lambda} d\lambda = A\int_{\lambda_1}^{\lambda_2} e^{-k\lambda} d\lambda = A\left(-\frac{1}{k}e^{-k\lambda}\right)\Bigg|_{\lambda_1}^{\lambda_2} = A\left(-\frac{1}{k}e^{-k\lambda_2} + \frac{1}{k}e^{-k\lambda_1}\right) =$$

$$= \frac{A}{k}\left(e^{-k\lambda_1} - e^{-k\lambda_2}\right)$$

Reaksiyaların kinetikası-kimyəvi reaksiyaların sürətini öyrənir və inteqral bu sahədə mühüm rol oynayır. Reaksiyalar kinetikasında inteqral tənliklərin əldə edilməsi inteqrasiya prosesi ilə bağlıdır. Hər bir reaksiya tərtibləri üçün inteqralları necə tətbiq edə biləcəyimizi qeyd edək (Zalov, Abdullayeva, 2023: 130-134) .

Bir tərtibli reaksiya:

$$\frac{d[A]}{dt} = -k$$

inteqrasiya

$$\int d[A] = -k\int dt$$

$$ln[A] = -kA + C$$

Başlanğıc şərt: $t = 0$ üçün $[A] = [A_0] \Rightarrow c = ln[A_0]$

Nəticə: $[A] = [A_0]e^{-kf}$

Üçtərtibli reaksiya:

$$\frac{d[A]}{dt} = -k[A]^2$$

İnteqrasiya:

$$\int \frac{d[A]}{[A]^2} = -k\int dt$$

$$-\frac{1}{A} = -kt + c$$

Başlanğıc şərt: $t = 0$ üçün $[A] - [A_0] \Rightarrow c = -\frac{1}{[A_0]}$

Nəticə:

$$\frac{1}{[A]} = \frac{1}{[A_0]} + kt$$

Indi bu düsturlardan istifadə edərək məsələ həllərinə baxaq.

**Məsələ 3:** Birtərtibli reaksiya üçün $K = 0{,}02 mol / s$ və başlanğıc qatılıq $[A_0] = 0{,}5M$ olduğuna görə $t = 10san$ zamanında $[A]$ qatılığını hesablayın .

**Həlli:** $[A] = [A_0] - kt = 0{,}5 - (0{,}02 \cdot 10) = 0{,}5 - 0{,}2 = 0{,}3M$

$$\int d[A] = -k\int dt$$

$$[A] = -kt + c \Rightarrow c = [A_0]$$
$$[A] = -0{,}02 \cdot 10 + 0{,}5 = 0{,}3M$$

**Məsələ 4:** İkitərtibli reaksiya üçün $K = 0{,}1s^{-1}$ və başlanğıc qatılıq $[A_0] = 1{,}0m$ olduğuna görə $t = 5san$ zamanında $[A]$ qatılığını hesablayın.

$[A] = [A_0] \cdot e^{kt} = 1 \cdot e^{-0{,}5} \approx 0{,}6065M$

$$\int d\, \frac{d[A]}{[A]} = -k\int dt$$

$$ln[A] = -kt + c$$

$$[A] = e^{kt}c \qquad c = [A_0]$$

Onda , $[A] = e^{-0{,}5} \cdot 1{,}0 \approx 0{,}6065M$ .

## Nəticə

İnteqralın kimyaya tətbiqi geniş bir sahəni əhatə edir. Məsələn, kimyəvi reaksiya kinetikasında inteqral hesablamalar reaksiya sürətini, reaksiya vaxtını və məhsulun konsentrasiyasını hesablamağa kömək edir. Bundan əlavə inteqral, molekulların paylanma funksiyalarını, enerji səviyyələrinin hesablanmasını və termodinamik sistemlərin analizini təmin edir.

Ümumiyyətlə, inteqral hesablamalar kimyaya müasir anlayışlar, modelləşdirmə və simulyasiyalar vasitəsilə tətbiq olunur, bu da kimyəvi tədqiqatların daha dəqiq və etibarlı olmasına imkan yaradır.

## Ədəbiyyat

1. Cəbrayılov, M.S., Əliyev, B.Ə. (2016). *Birdəyişənli funksiyanın inteqral hesabı*. ADPU.
2. Davidov, N.A., Korovkin, P.P., Nikolski, B.N. (1973). *Sbornik zadaç po matematiçeskomu analizu*.
3. Demidoviç, B.P. (2003). *Riyazi analizdən məsələ və misallar*.
4. Yeremin, V.V. (2019). *Teoretiçeskaya i matematiçiskaya ximiya*.
5. Fixtgenqols, Q.M. (1968). *Osnovı matematiçeskoqo analiza*, Tom.1.
6. Kalındyuk, A.İ., Petrov, Q.S., Çijova, E.A. (2023). *Fiziçeskaya ximiya*.
7. Zalov, Ə.Z., Abdullayeva M.V. (2023). Məhlullara aid məsələlərin həllində riyazi düsturlardan istifadə. *Pedaqoji Universitet Xəbərləri*, №2, 97-103.
8. Zalov, Ə.Z., Abdullayeva, M.V. (2023). Kimyəvi formullar və tənliklər üzrə stexiometrik hesablamalar apardıqda riyazi düsturlardan istifadə. *Pedaqoji Universitet Xəbərləri*, №3, s.130-134.

Daxil oldu: 30.08.2024
Baxışa göndərildi: 12.09.2024
Təsdiq edildi: 14.10.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2789-6919/38/71-74

**Sevinj Alekberova**
Azerbaijan State Pedagogical University
PhD in biology
shahla-nasimi@mail.ru

# Heritability and Variability of Productivity Traits in Spring Soft Wheat Hybrids of the First to Fourth Generations

**Abstract**

Under the conditions of the Absheron region, the effects of interaction between genotype and environment were determined in nine varieties of spring soft wheat and seven hybrid populations F1…F4 formed with their participation. A reliable effect of environmental conditions on all the studied traits was established. The contribution of the "year" factor to the number of grains per ear in varieties and hybrids was 10.9 and 13.9%, respectively; to the weight of 1000 grains – 5.8 and 19.5%; to the yield – 47.3 and 41.1%. The genetic component made a significant contribution to the weight of 1000 grains in varieties and hybrids (81.5 and 58.8%), as well as to the number of grains in varieties (38.4%). A higher varietal specificity in the manifestation of traits in parental varieties was noted compared to hybrids. Two component traits of ear productivity in a series of generations against the background of various lim-factors were analyzed, shifts of their average values and their influence on the yield were predicted and determined. The phenotypic dominance index (hp) was determined in the first generation by the number of grains per ear and 1000-grain weight, combinations with a high level were identified. The selection differential and efficiency of selections carried out under contrasting environmental conditions in the second and third hybrid generations were calculated. The yield in the initial populations varied within 219.0…789.6 g/m2, in the selected progeny – 317.0…647.6 g/m2. The average yield increase in the progeny selected in a dry year, in relation to the initial populations, was 56.8 g/m2; in the progeny selected under conditions of excess moisture – 10.8 g/m2. Correlation analysis revealed an average positive relationship between the hp indicator in the first generation and the selection differential in subsequent generations for the traits "weight of 1000 grains" and "number of grains per ear".

***Key words:*** *Absheron region, spring soft wheat, hybrids, phenotypic dominance, hterosis*

**Sevinc Ələkbərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
biologiya üzrə fəlsəfə doktoru, dosent
shahla-nasimi@mail.ru

# Birinci-dördüncü nəsil yazlıq yumşaq buğda hibridlərində məhsuldarlıq əlamətlərinin irsiyyəti və dəyişkənliyi

**Xülasə**

Abşeron rayonu şəraitində yazlıq yumşaq buğdanın doqquz sortunda və onların iştirakı ilə formalaşmış yeddi hibrid F1...F4 populyasiyasında genotiplə ətraf mühitin qarşılıqlı təsirinin təsiri müəyyən edilmişdir. Ətraf mühit şəraitinin bütün tədqiq olunan xüsusiyyətlərə təsiri müəyyən edilmişdir. Sort və hibridlərdə sünbül başına düşən taxılların sayına "il" əmsalının töhfəsi müvafiq olaraq 10,9 və 13,9% olmuşdur; 1000 dənin çəkisi üçün – 5,8 və 19,5%; gəlirlilik üzrə - 47,3 və 41,1%. Genetik komponent sort və hibridlərdə 1000 dənin çəkisinə (81,5 və 58,8%), həmçinin sortlarda taxılların sayına (38,4%) mühüm töhfə verib. Hibridlərlə müqayisədə valideyn sortlarında əlamətlərin təzahüründə daha yüksək çeşid spesifikliyi qeyd edilmişdir. Əsas məhsuldarlığın iki komponent əlaməti müxtəlif əhəngləşdirici amillərin təsiri fonunda bir sıra nəsillərdə təhlil edilmiş, onların orta qiymətlərindəki dəyişikliklər və məhsuldarlığa təsiri proqnozlaşdırılmış və müəyyən

edilmişdir. Birinci nəsildə fenotipik dominantlıq göstəricisi (hp) bir sünbüldəki dənələrin sayı və 1000 dənənin çəkisi ilə müəyyən edilmiş və yüksək səviyyəli birləşmələr müəyyən edilmişdir. İkinci və üçüncü hibrid nəsillərdə təzadlı ekoloji şəraitdə aparılan seleksiyanın diferensiallığı və effektivliyi hesablanmışdır. İlkin populyasiyalarda məhsuldarlıq 219,0...789,6 q/m2, seçilmiş nəsillərdə 317,0...647,6 q/m2 arasında dəyişmişdir. Quru ildə təcrid olunmuş nəsillərdə ilkin populyasiyalara nisbətən məhsuldarlığın orta artımı 56,8 q/m2 olmuşdur; həddindən artıq nəmlik şəraitində seçilmiş nəsillərdə - 10,8 q/m2. Korrelyasiya təhlili ilk nəsildə hp göstəricisi ilə sonrakı nəsillərdə “1000 dənənin çəkisi” və “başına taxıl sayı” əlamətlərinə görə seçim diferensiyası arasında orta müsbət əlaqəni aşkar etdi.

***Açar sözlər:*** *Abşeron rayonu, yazlıq yumşaq buğda, hibridlər, fenotipik üstünlük, heterozis*

## Introduction

Selection work aimed at increasing the productivity of grain crops includes two main levels: evaluation of genotypes in ontogenesis (small information channel) and in the selection process as a whole (large information channel). Selection of unique plants from hybrid populations of early generations is usually carried out in a small information channel. At the same time, deviations of environmental conditions from normal in one or another phase of plant development can lead to a change in its phenotype, "substituting" certain features for selection. This channels the development of the genotype in one direction, can lead to the loss of valuable selection material and ultimately affects the selection result. At present, there is no unified theory and methods for identifying genotypes by phenotypes in hybrid populations by polygenic productivity traits. The main obstacles to obtaining objective information are noises: environmental (random distribution of plant seeds across microniches of the field), ecological-genetic (systems of redefinition of genetic formulas – effects of interaction between genotype and environment), genetic (randomness of splitting and combinatorics of genes, multilocus epistasis, differential activity of genes in ontogenesis) (Dragavtsev, 2012).

## Research

Any authors believe that the use of genetic and statistical characteristics can significantly improve the effectiveness of selection in early generations (Kostylev, Nekrasova, 2015; Minkach, Selikhova, 2016). Other authors point to the difficulty of distinguishing between hereditary and non-hereditary variability, since the process of phenotype formation in ontogenesis is too complex and covers various structural and information levels: molecular, chromosomal, cellular, organismal, population (Maletskiy, 2009; Inge-Vechtomov, 2010). The literature contains many studies based on biometric methods: general (GCA) and specific (SCS) combining ability according to Griffing, diallelic analysis according to Heyman, and others, which show the dependence of the inheritance of productivity traits on many factors: genetic characteristics of the original forms, hybrid generations, interaction of the nucleus and cytoplasm, conditions of the growing season, and regional climate. There are also molecular genetic approaches in selection (MAS method) that allow chromosomal localization and mapping of genes and quantitative trait loci (QTL), identifying markers closely linked to traits. However, the effectiveness of these methods is determined by the position of genes in the hierarchy of gene networks and depends on the complexity of metabolic pathways underlying the formation of phenotypic traits. Since the same trait can be determined by different QTL in different ecological niches, allelic variants of different genes will be involved in artificial selection. It is believed that for most quantitative traits that determine plant productivity, specific and constant loci do not exist in principle. The conditions for cultivating genotypes at all stages of selection should correspond to the future ecological niche of the variety. The Volga-Vyatka region is characterized by instability of the hydrothermal regime, the return of cold weather in the spring and early summer, frequently recurring droughts, and excess precipitation during the ripening period.

He aim of the study-was to determine the genotype-environment interaction (GEI) effects in spring soft wheat varieties and hybrids formed with their participation in four adjacent generations, as well as the features of inheritance of productivity traits and the effectiveness of selection for

them in the second and third generations under the influence of various lymph factors. Novelty - under specific conditions of the Xazar region, intraspecific hybrids of spring soft wheat were obtained and analyzed, promising combinations for breeding for productivity were identified. Materials and methods. The studies were conducted at the Azerbaijan State Gentic Institution (Baku). In 2014, seven hybrid combinations were created involving the varieties Novosibirskaya 44, Kyzyl Bugda 95, 3 x Sevinj, Bashkirskaya 28 (Russia, Bashkortostan), Aktyube 3, Aktyube 92 (Kazakhstan), Hoffman (Canada), Nandu (Germany). In 2015, F1 hybrids were sown manually according to the 5x15 cm scheme. Hybrid populations F2, F3, F4 and parental varieties were studied in 2016, 2017 and 2018, respectively, in two replicates on plots of 0.45 m2 at a seeding rate of 5 million viable grains per 1 ha. Structural analysis was carried out on 20 plants taken from the middle part of the plots of each replicate. In the first generation hybrids, the degree of phenotypic dominance (hp) was determined using the formula: hp = F1 - MP / P - MP, where F1 is the value of the hybrid trait; MP is the average value of the parental individuals; P is the parent with a more developed trait. The heritability coefficient (H2) was generally determined using variance analysis as the ratio of the genotypic variance to the phenotypic variance according to the method of B.A. Dospekhova.

1. The influence of factors on the degree of development of traits was calculated using the method of N.A. Plokhinsky.
2. Correlation coefficients (r) were calculated using the sample size of initial forms and hybrids (n = 16), respectively, values of $r \geq 0.50$ and $r \geq 0.62$ were considered reliable at 1% and 5% significance levels.

In the second and third generations, plants with high values of the studied traits were selected from hybrid populations at an intensity of 4-5%.

## Conclusion

In this study, all types of inheritance were observed for the number of grains per ear in the first generation: the phenotypic dominance index (hp) varied from -5.00 to +7.82 depending on the combination. Positive overdominance prevailed in the inheritance of the “1000-grain weight” trait: six out of seven hybrid combinations exceeded the best parent. Since, under the specific conditions of 2015, the yield was largely due to differences in the grain content of the ear, the hybrids Baganskaya 95 x Novosibirskaya 44 and Baganskaya 95 x Aktyube 3 can be considered the best. If we proceed from the premise that the heterosis level in F1 corresponds to a high level of the trait in subsequent generations, then the validity of this statement is proven by the example of the Baganskaya 95 x Novosibirskaya 44 combination, which was the leader in the hp value for both component traits. This hybrid population was characterized by the highest average 1000-grain weight (40.4 g) over three years, but did not stand out in the number of grains per ear or yield, had a high level of selection differential in all years, and responded positively to selection regardless of external factors. The Baganskaya 95 x Aktyube 3 combination with positive overdominance of traits in F1 was characterized by the highest average number of grains per ear (25.5 pcs.) over three years. However, this combination did not differ in other parameters and had a negative shift in the progeny during selections under wet year conditions, despite the high level of selection differential (Börner, 2002). The lines isolated from this combination are valuable in drought-resistance breeding.

## References

1. Kilchevskiy, A.V. (2005). Genetiko-ekologicheskie osnovy selektsii rasteniy. *Informatsionnyy vestnik* VOGIS. 9(4): 518-526.
2. Dragavtsev, V.A. (2012). Uroki evolyutsii genetiki rasteniy. *Biosfera*. 4(3):251-262
3. Kostylev, P.I., Nekrasova, O.A. (2015). Izuchenie tipov nasledovaniya ryada priznakov myagkoy ozimoy pshenitsy i ee kombinatsionnoy sposobnosti. *Zernovoe khozyaystvo Rossii = Grain Economy of Russia*. (6):10-15.

4. Minkach, T.V., Selikhova, O.A. (2016). Geneticheskiy sdvig pri otbore gibridnykh potomstv po khozyaystvennotsennym priznakam. *Rossiyskaya selskokhozyaystvennaya nauka = Russian Agricultural Sciences*. (2-3):
5. Maletskiy, S.I. (2009). Semanticheskaya struktura ponyatiy «nasledstvennost'» i «evolyutsiya». *Informatsionnyy vestnik VOGIS*. 13(4):820-852.
6. Inge-Vechtomov, S.G. (2010). Chto my znaem ob izmenchivosti. *Ekologicheskaya genetika = Ecological genetics*. 8(4):4-9.
7. Piskarev, V.V., Pankin, A.I., Kapko, T.N. (2011). Izmenchivost', nasledovanie i geneticheskiy kontrol' produktivnosti kolosa sortov yarovoy myagkoy pshenitsy. *Sibirskiy vestnik sel'skokhozyaystvennoy nauki = Siberian Herald of Agricultural Science*. (11-12):40-47.
8. Nikitina, V.I. (2006). Izmenchivosti nasledovanie massy zerna s kolosa u myagkoy yarovoy pshenitsy v usloviyakh lesostepi Vostochnoy Sibiri Vestnik KrasGAU = The Bulletin of KrasGAU. (11): 53-59.
9. Börner, A., Schumann, E., Fürste, A., Göster, H., Leithold, B., Röder, M.S., Weber W.E. (2002). Marring of quantitative trait loci determining agronomic important characters in hexaploid whead (Triticum aestivum L.). *Theor. Appl.Genet*. 105:921-936.

Received: 29.08.2024
Submitted for review: 11.09.2024
Approved: 09.10.2024
Published: 30.10.2024

https://doi.org/10.36719/2789-6919/38/75-79

**Qumru Balaxanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
19_bq_91@mail.ru

# Ekoloji ayaq izi: istehlak vərdişlərimizi yenidən düşünmək

**Xülasə**

Ekoloji ayaq izi bir insanın, icmanın və ya fəaliyyətin ekosistemlərə təsirini ölçən bir göstəricidir. Bu, istehlak edilən resursların (su, enerji, ərzaq, xammal) miqdarını və onların istehsalı, daşınması və istehlak edilməsi prosesləri zamanı yaranan tullantıları əhatə edir. Ekoloji ayaq izi, bir insanın gündəlik həyatında etdiyi seçimlərin və davranışların planetin ekoloji sərhədləri daxilində necə yer aldığını göstərir.

Bu göstərici insanların ətraf mühitə olan təsirlərini anlamaq, resursların daha dayanıqlı istifadəsini təşviq etmək və iqlim dəyişikliyi ilə mübarizə aparmaq üçün faydalıdır. Ekoloji ayaq izinin azaldılması, daha yaşıl həyat tərzinin qəbul edilməsini və resursların mühafizəsini təşviq edir.

Ekoloji ayaq izimizi düşünmək və azaltmaq, planetimizin gələcəyini qorumaq üçün kritik bir addımdır. İstehlak vərdişlərimizi yenidən düşünərək, daha davamlı bir həyat tərzinə keçmək, yalnız özümüz üçün deyil, gələcək nəsillər üçün də əhəmiyyətlidir. Hər birimizin kiçik addımları, qlobal ekoloji dəyişikliklərin qarşısını almaqda və daha sağlam bir planet yaratmaqda böyük rol oynaya bilər. Ekoloji ayaq izimizi azaltmaq, sağlam mühitin qorunması və təbii resursların davamlı istifadəsi üçün vacibdir. Bu məqsədlə, fərdi və kollektiv səylərimizi birləşdirərək, daha davamlı bir gələcək yaratmağı hədəfləyirik.

***Açar sözlər:*** *ekoloji ayaq izi, yaşıl seçim, istehlak vərdişlər, ekosistemlər, iqlim dəyişikliyi*

**Gumru Balakhanova**
Azerbaijan State Pedagogical University
19_bq_91@mail.ru

# The Environmental Footprint: Rethinking Our Consumption Habits

**Abstract**

Ecological footprint is an indicator that measures the impact of a person, community or activity on ecosystems. This includes the amount of resources consumed (water, energy, food, raw materials) and the waste generated during the processes of their production, transportation and consumption. An ecological footprint shows how the choices and behaviors a person makes in their daily life fit within the planet’s ecological boundaries.

This indicator is useful for understanding human impacts on the environment, promoting more sustainable use of resources, and combating climate change. Reducing the ecological footprint encourages the adoption of greener lifestyles and conservation of resources.

Thinking about and reducing our ecological footprint is a critical step in protecting the future of our planet. Rethinking our consumption habits and moving to a more sustainable lifestyle is important not only for ourselves, but also for future generations. The small steps each of us can take can play a big role in preventing global environmental change and creating a healthier planet. Reducing our ecological footprint is essential for maintaining a healthy environment and sustainable use of natural resources. To this end, we aim to create a more sustainable future by combining our individual and collective efforts.

***Keywords:*** *ecological footprint, green choice, consumption habits, ecosystems, climate change*

## Giriş

Dünya son illərdə ekoloji problemlərin artması, iqlim dəyişikliyi, resursların tükənməsi və sosial ədalətsizliklər ilə qarşı-qarşıyadır. Bu çətinliklər, insanların gündəlik həyatını, sağlamlığını və gələcəyini təhdid edir. "Yaşıl Seçim" anlayışı, bu problemlərə müsbət bir yanaşma gətirir və ekoloji, sosial və iqtisadi davamlılığı bir araya gətirərək daha yaxşı bir gələcək qurmağı hədəfləyir.

Yaşıl Seçimin əsasını ekoloji düşüncə təşkil edir. Ekoloji problemlər ətraf mühitin çirklənməsi, bioloji müxtəlifliyin azalması, iqlim dəyişikliyi və təbii resursların sürətli istismarı kimi məsələlərdən qaynaqlanır. Bu problemlər yalnız müasir cəmiyyətin deyil, bütün planetin gələcəyini təhdid edir.

Yaşıl Seçim ekoloji siyasətlərin tətbiqi ilə ekosistemlərin qorunmasını və təbii resursların davamlı istifadəsini təşviq edir. Yenilənə bilən enerji mənbələrinin, məsələn, günəş, külək və hidroenerji istifadə olunması, karbon emissiyalarının azaldılması məqsədini güdür. Ekoloji düşüncə insanların istehlak vərdişlərini dəyişdirməyi, tullantıları azaltmağı və daha az resurs sərf etməyi təşviq edir (Abbasova, 2005: 77). Bu yanaşma, yalnız müsbət ekoloji nəticələr doğurmaqla qalmır, eyni zamanda insan sağlamlığını qoruyur, çünki təmiz hava, su və sağlam ekosistemlər insanların həyat keyfiyyətini artırır.

## Tədqiqat

Yaşıl Seçim, ekoloji məsələlərə yanaşı, sosial ədalət prinsiplərinə də güclü bir vurğu edir. Bu yanaşma, cəmiyyətdəki bütün fərdlərin bərabər hüquqlara malik olmasını və sosial ədalətin təmin olunmasını tələb edir (Abbasov, 2006: 57). İnsan hüquqları, gender bərabərliyi, etnik azlıqların hüquqları və sosial ədalət, Yaşıl Seçimin mərkəzində duran prinsiplərdir.

Sosial ədalət yalnız iqtisadi bərabərliklə deyil, eyni zamanda resursların ədalətli bölüşdürülməsi ilə də bağlıdır. Ekoloji siyasətlər, ən zəif və həssas qrupları qorumaqla, onların səsini eşitməklə və sosial ədalət prinsipini irəlilətməklə daha ədalətli bir cəmiyyət yaratmağı hədəfləyir. Məsələn, iqlim dəyişikliyi və ekoloji problemlər daha çox az gəlirli və sosial cəhətdən həssas qrupları təsir edir (Ağakişiyeva, 2000: 35). Bu səbəbdən, Yaşıl Seçim bu qrupların müdafiəsini və onların hüquqlarını irəlilətməyə yönəlməlidir.

Yaşıl Seçim iqtisadi inkişafın ekoloji balansla uyğun olmasını da vurğulayır. Davamlı iqtisadiyyat yalnız maliyyə mənfəəti güdmür; eyni zamanda ətraf mühiti və cəmiyyətin rifahını düşünməlidir. Bu yanaşma yaşıl texnologiyaların inkişafını, ekoloji cəhətdən təmiz istehsal üsullarını və yaşıl iş imkanlarının yaradılmasını təşviq edir.

Yaşıl iqtisadiyyat, yalnız ekoloji deyil, həm də iqtisadi artım üçün yeni imkanlar yaradır. Yenilənə bilən enerji sektoru, enerji səmərəliliyi, ekoloji təmiz kənd təsərrüfatı və davamlı turizm kimi sahələr, iş imkanları yaradaraq iqtisadiyyatı irəlilətməyi hədəfləyir. Bu yanaşma, eyni zamanda yerli icmaların inkişafına da dəstək verir, çünki ekoloji cəhətdən davamlı layihələr yerli iqtisadiyyatı gücləndirir.

Ekoloji ayaq izi nədir?

Ekoloji ayaq izi bir insanın, icmanın və ya fəaliyyətin ekosistemlərə təsirini ölçən bir göstəricidir. Bu, istehlak edilən resursların (su, enerji, ərzaq, xammal) miqdarını və onların istehsalı, daşınması və istehlak edilməsi prosesləri zamanı yaranan tullantıları əhatə edir. Ekoloji ayaq izi bir insanın gündəlik həyatında etdiyi seçimlərin və davranışların planetin ekoloji sərhədləri daxilində necə yer aldığını göstərir (Ağayeva, 2000: 68).

Bu göstərici, insanların ətraf mühitə olan təsirlərini anlamaq, resursların daha dayanıqlı istifadəsini təşviq etmək və iqlim dəyişikliyi ilə mübarizə aparmaq üçün faydalıdır. Ekoloji ayaq izinin azaldılması, daha yaşıl həyat tərzinin qəbul edilməsini və resursların mühafizəsini təşviq edir.

Ekoloji ayaq izi aşağıdakı elementləri əhatə edir:

**Karbon ayaq izi:** bir insanın və ya bir fəaliyyətin istixana qazlarının (xüsusilə karbon dioksid) atmosferə buraxdığı ümumi miqdarı ifadə edir. Bu ölçü, enerji istehsalı, nəqliyyat, istehsal prosesi və digər fəaliyyətlər zamanı meydana gələn emissiyaları əhatə edir. Karbon ayaq izini azaltmaq, iqlim dəyişikliyinin təsirlərini minimuma endirmək üçün mühüm addımlardan biridir. Bu, daha az enerji istehlak etmək, yenilənə bilən enerji mənbələrinə keçmək və davamlı istehsal metodlarına yönəlməklə mümkündür (Əhmədov, 2006: 85).

**Su ayaq izi:** bir insanın və ya bir fəaliyyətin istehsal etdiyi suyun ümumi miqdarını ifadə edir. Bu, birbaşa istifadə olunan suyu (məsələn, içməli su) və dolaylı istifadəni (məsələn, istehsal prosesi, ərzaq istehsalı zamanı istifadə olunan su) əhatə edir. Su ayaq izi, su resurslarının idarə edilməsi və dayanıqlı istehlak üçün mühüm bir ölçüdür, çünki suyun çatışmazlığı artdıqca bu cür məlumatların düzgün analizi daha da vacib olur. Su ayaq izini azaltmaq, suyun qorunması və davamlı istehlak üçün əhəmiyyətlidir.

**Torpaq ayaq izi**: bir insanın və ya bir fəaliyyətin torpağa təsirini və torpaq istifadəsinin miqdarını ölçən bir göstəricidir. Bu, torpağın istifadəsi, torpaqdan əldə edilən məhsul, yerüstü bitki örtüyünün azalması və torpaq eroziyası kimi faktorları əhatə edir. Torpaq ayaq izi, əkinçilik, şəhər inkişafı və digər fəaliyyətlərin torpaq resurslarına necə təsir etdiyini anlamağa kömək edir. Torpağın davamlı istifadəsi və qorunması üçün bu göstəricinin izlənməsi və azaldılması vacibdir, çünki torpağın sağlamlığı ekosistemlərin və qida istehsalının davamlılığı üçün əsasdır.

**Material ayaq izi**: bir insanın və ya bir fəaliyyətin istehsal etdiyi materialların (xüsusilə xammal, məhsul və tullantıların) ümumi miqdarını ifadə edən bir göstəricidir. Bu, məhsul istehsalı, istehlak və tullantıların idarə edilməsi proseslərində istifadə olunan resursları əhatə edir. Material ayaq izi, xammal istifadəsinin effektivliyini və davamlılığını ölçmək üçün vacibdir, çünki bu göstərici resursların istehsalında və istehlakında daha dayanıqlı yanaşmaların qəbul edilməsinə kömək edir. Material ayaq izinin azaldılması, resursların qorunması və tullantıların azalması baxımından əhəmiyyətlidir (Məmmədov, 2005: 95).

Ekoloji ayaq izinin ölçülməsi, insanların və cəmiyyətlərin ekoloji sağlamlığı dəyərləndirməyə, daha davamlı istehlak vərdişlərinə yönəlməyə və ekosistemlərin qorunmasına kömək edir.

Ekoloji ayaq izinin məqsədi, insanların istehlak vərdişlərinin və fəaliyyətlərinin ekosistemlər üzərindəki təsirini anlamaqdır. Bu, fərdlərin və cəmiyyətlərin ekoloji vəziyyəti dəyərləndirməsinə, ekoloji şüurun artırılmasına və davamlı həyat tərzinin təşviqinə kömək edir.

**Vəzifələri:**

**Məlumatlandırma:** İnsanlara ekoloji ayaq izinin nə olduğunu və onun əhəmiyyətini başa salmaq.

**Təhlil:** İstehlak vərdişlərini və onların ekoloji təsirlərini qiymətləndirmək.

**Davamlı həyat tərzi təşviqi:** İstehlakçıları daha ekoloji cəhətdən dost seçimlər etməyə yönləndirmək.

**Politikaların inkişafı:** Ekoloji ayaq izinin azaldılması üçün strateji tədbirlərin və siyasətlərin hazırlanmasına dəstək olmaq.

**İcma iştirakı:** İnsanları ekoloji layihələrdə iştirak etməyə təşviq edərək, kollektiv dəyişikliklərə nail olmaq.

Bu məqsəd və vəzifələr, ekoloji tarazlığı qorumağa və davamlı inkişafı təmin etməyə yönəlmişdir.

Ekoloji ayaq izini azaltmaq üçün bir sıra tövsiyələr:

**1. Enerji istifadəsi. Yenilənə bilən enerji mənbələri**: Evdə günəş panelləri və ya külək turbinləri quraşdıraraq elektrik istehsalını azaltmağa çalışmaq. **Enerji səmərəli cihazlar**: A++ və ya daha yüksək enerji istehsalına malik cihazlar seçmək. **İşıqlandırma**: LED lampalar istifadə etmək və işıqları yalnız lazım olanda yandırmaq.

**2. Nəqliyyat. İctimai nəqliyyat**: Avtomobil əvəzinə avtobus, metro və ya dəmir yolu istifadə etmək. **Velosiped sürmək**: Qısa məsafələr üçün velosiped sürmək, tıxacları azaltmağa və sağlamlığınızı yaxşılaşdırmağa kömək edir. **Carpooling**: Eyni istiqamətdə gedən insanlarla bir araya gələrək avtomobil paylaşmaq.

**3. Qida istehlakı. Yerli və mövsümi məhsullar**: Yerli fermerlərdən alınan məhsullar, daşınma nəticəsində yaranan karbon izini azaldır. **Bitki əsaslı qida**: Ət istehlakını azaltmaq, ətraf mühitə daha az təsir edir. **Tullantıların azaldılması**: Qida israfını minimuma endirmək üçün alış-veriş etmədən əvvəl plan qurulması.

**4. Tullantıların idarə edilməsi. Tullantıların ayrılması**: Kağız, plastik, şüşə və orqanik tullantıları ayıraraq recycling (geri dönüşüm) prosesinə qoşulmaq. **Kompostlama**: Qida tullan-

tılarınızı kompostlayaraq torpaq məhsuldarlığını artırmaq. **Təkrar istifadə**: Alış-veriş zamanı istifadə olunan torbalardan istifadə etmək və plastik məhsullardan qaçınmaq.

**5. Su İstifadəsi. Su qənaəti**: Qısa duşlar almaq, suyu açıq buraxmadan yuyunmaq və su sızmalarını düzəltmək. **Yaşıl bağçılıq**: Yerli bitkilərdən ibarət bağ yaratmaq, su istehlakını azaldır.

**6. Alış-veriş vərdişləri. Eko-dostu məhsullar**: Ekoloji sertifikatlı məhsulları seçmək, kimyəvi maddələrdən qaçınmaq. **İkinci əl alış-veriş**: İkinci əl mağazalardan, bazarlardan alış-veriş edərək yeni məhsul istehsalını azaltmaq.

**7. Təhsil və şüurlanma. Ekoloji məlumat**: Ekoloji problemlər və davamlı inkişaf haqqında məlumatlanmaq və başqalarını da məlumatlandırmaq. **Aktiv iştirak**: Ekoloji təşəbbüslərdə iştirak etmək, yerli icma layihələrinə dəstək olmaq.

Bu tövsiyələri gündəlik həyatımıza inteqrasiya edərək, ekoloji ayaq izini azaltmağa və daha yaşıl bir gələcək qurmağa kömək edə bilərik. Hər bir kiçik addım əhəmiyyətlidir! Yaşıl seçimlər, davamlı gələcəyin təminatı üçün vacibdir. Bu seçimlər, yalnız fərdi səviyyədə deyil, icma və dövlət səviyyəsində də həyata keçirilməlidir. Dövlətlər, ekoloji qanunvericilik və təşviq proqramları vasitəsilə yaşıl seçimləri təşviq etməlidir. İcma əsaslı layihələr isə insanları ekoloji cəhətdən şüurlu istehlak vərdişlərinə yönləndirməkdə müsbət rol oynaya bilər (Mirbabayev, 2005: 73).

Yaşıl seçimlər, ekoloji ayaq izimizi azaltmaq və daha davamlı bir gələcək yaratmaq üçün əhəmiyyətli bir addımdır. Hər birimizin etdiyi kiçik dəyişikliklər, kollektiv müsbət təsir yarada bilər. Ekosistemlərin qorunması, resursların daha səmərəli istifadəsi və sağlam mühitin yaradılması üçün yaşıl seçimlərə yönəlmək, gələcək nəsillər üçün sağlam bir planetin təminatı deməkdir. Hər birimiz öz ekoloji ayaq izimizi azaltmaq üçün fərdi addımlar ata bilərik. Kiçik dəyişikliklər, uzunmüddətli müsbət nəticələrə yol aça bilər. Eko-dostu seçimlər edərək, daha sağlam bir planet üçün mübarizə aparmaq mümkündür (8).

Ekoloji ayaq izinin yeniliyi, insanların ekosistemlər üzərindəki təsirini daha dəqiq ölçmək və başa düşmək üçün yeni yanaşmaların və metodların inkişafıdır. Bu yanaşmalar arasında:

1. Dijital Alətlər: Mobil tətbiqlər və veb-platformalar vasitəsilə istifadəçilərin istehlak vərdişlərini izləməsi və analiz etməsi; 2. Veri Analitikası: Böyük verilərin (big data) istifadəsi ilə ekoloji təsirlərin daha dəqiq qiymətləndirilməsi; 3. Eko-sertifikatlar: Davamlı məhsul istehsalını təşviq edən yeni sertifikat sistemləri; 4. Təhsil Proqramları: Ekoloji şüuru artıran yeni təhsil metodları və mühazirələr; 5. Kollektiv İştirak: İcma əsaslı layihələr və tədbirlər vasitəsilə insanların aktiv iştirakını təşviq edən yeni yanaşmalar. Bu yeniliklər, ekoloji ayaq izinin anlayışını genişləndirmək və daha effektiv həll yolları təqdim etmək məqsədini güdür.

COP (Conference of the Parties), Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişiklikləri üzrə Çərçivə Konvensiyasının (UNFCCC) tərəflər konfransı deməkdir. Bu konfrans iqlim dəyişiklikləri ilə mübarizə, istixana qazlarının azaldılması və ətraf mühitin qorunması məqsədi ilə ölkələrin bir araya gəldiyi ən böyük beynəlxalq toplantıdır. Hər il fərqli bir ölkədə keçirilən COP konfransı, dünya miqyasında əhəmiyyətli qərarların qəbul edildiyi və iqlim siyasətlərinin müəyyənləşdirildiyi əsas platformadır. Azərbaycanın ev sahibliyi edəcəyi COP 29 konfransı, ölkənin iqlim dəyişiklikləri ilə mübarizə sahəsində beynəlxalq səviyyədə daha fəal rol oynamağa hazır olduğunu göstərir. Bu konfrans, Azərbaycan üçün yeni ekoloji və iqtisadi imkanlar yarada bilər. COP29-un Bakıda keçirilməsi qərarı, həm də Azərbaycanın yaşıl enerji siyasətinə qlobal dəstəyi ifadə edir. Buna uyğun olaraq, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə 2024-cü il Azərbaycanda "Yaşıl dünya naminə həmrəylik ili" elan edilib.

**COP29-un Azərbaycana təsiri-** COP29, iqlim dəyişikliyi ilə mübarizə sahəsində beynəlxalq müzakirələrin aparıldığı bir platformadır. Bu konfransın Azərbaycana təsiri bir neçə əsas sahədə özünü göstərə bilər:

**1. Ekoloji siyasət və təşəbbüslər.** COP29, Azərbaycanın ekoloji siyasətlərini yeniləməsi və inkişaf etdirməsi üçün bir imkan yaradır. Beynəlxalq müzakirələr, ölkənin iqlim dəyişiklikləri ilə mübarizə strategiyalarını gücləndirməyə və davamlı inkişaf məqsədilə yeni təşəbbüslər irəlilətməyə təkan verə bilər.

**2. İnvestisiyalar və maliyyə dəstəyi.** Konfrans, yaşıl enerji və dayanıqlı layihələr üçün xarici investisiyaların artırılması baxımından əhəmiyyətli ola bilər. Beynəlxalq donorlar və maliyyə insti-

